AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2021, № 3 (269), 39-48
https://dx.doi.org/10.48445/y2017-1068-5447-a

**M E T O D İ K A**

# Müasir ədəbiyyat dərslərində Nizami Gəncəvinin həyat və yaradıcılığının öyrənilməsi imkanları

***Bilal Həsənli***
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent, Əməkdar müəllim. Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan. E-mail: bilalhasanli@yahoo.com
https://orcid.org/0000-0002-6964-0546

**XÜLASƏ**
Məqalədə Azərbaycanın dahi şairi, dünya ədəbiyyatında özünəməxsus mövqeyə malik olan Nizami Gəncəvinin həyat və yaradıcılığının ümumtəhsil məktəblərinin ədəbiyyat dərslərində öyrənilməsi gənc nəslin ədəbi təhsili, inkişafı, milli və ümumbəşəri mənəvi dəyərlərə yiyələnməsi, mütərəqqi dünyagörüşünə malik şəxsiyyət kimi formalaşması baxımından müstəsna əhəmiyyətə malik olduğundan söz açılır. Nizami yaradıcılığının böyük tərbiyə potensialı ədəbiyyat dərslərində sənətkarın əsərlərinin ədəbi-tarixi və mənəvi-estetik aspektlərinin diqqət mərkəzinə çəkilməsi, müzakirəsi vasitəsilə reallaşdırılır. Nizaminin şair-vətəndaş kimi fəal həyat mövqeyinin, yaradıcılığının dərindən qavranılması, ilk növbədə, onun şəxsiyyətini səciyyələndirən cəhətlər və əsərlərinin ideya-bədii xüsusiyyətləri üzrə dolğun biliklər əldə edilməsini ehtiva edir. Bu baxımdan, dərsdə yeni təlim texnologiyalarından, interaktiv təlim metodlarından, fəal iş formalarından, əlavə mənbələrdən istifadə olunması zəruridir.

**AÇAR SÖZLƏR**
şair, poema, yaradıcılıq, dərs, metod, interaktiv, təhlil, müzakirə

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 03.08.2021
qəbul edilib: 10.08.2021

**MƏQALƏNİ ÇAPA MƏSLƏHƏT BİLƏN**
Filologiya elmləri doktoru, professor İsmayıl Kazımov.

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2021, NO. 3, VOL. 269, 39-48
https://dx.doi.org/10.48445/y2017-1068-5447-a

METHODS

# Opportunities to study the life and creativity of the Nizami Ganjavi in modern literature classes

***Bilal Hasanli***
Doctor of Philosophy in Pedagogy, Associate Professor, Honored Teacher. ASPU. Azerbaijan. E-mail: bilalhasanli@yahoo.com
https://orcid.org/0000-0002-6964-0546

**ABSTRACT**
The study of the life and work of the great Azerbaijani poet Nizami Ganjavi, who has a special place in world literature, in literature classes in secondary schools is of exceptional importance for the young generation, literary education, development, national and universal spiritual values, active, creative and progressive outlook. The study of Nizami's artistic heritage resonates with the tasks of modern education, the active life position of students, their dreams and thoughts about the future. The great educational potential of Nizami's creativity is realized through the discussion of the literary-historical and spiritual-aesthetic aspects of the artist's works in literature lessons. Deep understanding of Nizami's active life position as a poet-citizen, his creativity, first of all, includes the acquisition of full knowledge on the features and content of his works, ideological and artistic features that characterize his personality. From this point of view, it is necessary to use new learning technologies, interactive teaching methods, active forms of work, additional resources in the lesson.

**KEYWORDS**
poet, poem, creativity, lesson, interactive teaching method, analysis, discussion

**ARTICLE HISTORY**
Received: 03.08.2021
Accepted: 10.08.2021

## Giriş / Introduction

Ümumi və tam orta təhsil pilləsində ədəbiyyat dərslərində Nizami Gəncəvinin həyat və yaradıcılığı müasir ədəbiyyatşünaslıq elminin və ədəbiyyat tədrisi metodikasının nailiyyətləri zəminində öyrənilir. Əvvəlki fənn proqramlarına uyğun olaraq, qüdrətli sənətkarın tərcümeyi-halı, yaradıcılığının tədrisinə dair bəzi tədqiqatlar aparılsa, məqalələr nəşr olunsa da, hazırda təlim prosesində Nizami yaradıcılığına müasirlik baxımından yanaşma, məktəb təcrübəsinin ümumiləşdirilməsi mühüm əhəmiyyət kəsb edir.

X sinifdə Nizami Gəncəvinin həyat və yaradıcılığının öyrənilməsinə 5 dərs saatı ayrılmışdır:

1. Nizami Gəncəvinin həyat və yaradıcılıq yolunun öyrənilməsi – 1saat;
2. “İskəndərnamə” poemasının məzmunu üzrə iş – 2 saat;
3. Poemanın təhlili üzrə iş – 2 saat.

Böyük sənətkarın həyat yolunun öyrənilməsi şagirdlərə güclü emosional, tərbiyəvi təsir göstərir. Odur ki, müəllim poetik təqdimatında şagirdlərin yaş və qavrama səviyyəsini nəzərə alaraq, şairin tərcümeyi-halı ilə bağlı ibrətamiz faktlardan geniş istifadə etməlidir. Təlim prosesində şagirdlər sənətkarın şəxsiyyəti, bənzərsiz istedadı barədə dolğun təsəvvürə malik olmalıdır. Nizaminin yaradıcılığı yüksək mənəvi ideyalar, dərin humanist, fəlsəfi fikirlər xəzinəsidir. Onun öz dövründə baş verən hadisələrə, dövrün hökmdarlarına, saray mühitinə və sadə insanlara münasibəti, insanların xoşbəxt yaşayacağı ədalətli cəmiyyət haqqında arzu və düşüncələri ilə bağlı biliklərin mənimsənilməsi şagirdlərdə fəal həyat mövqeyinin formalaşmasında mühüm rol oynayır.

## Nizaminin yaşayıb-yaratdığı dövrün, mühitin, tarixi şəraitin aydınlaşdırılmasının əhəmiyyəti

Şairin həyat və yaradıcılığı öyrənilərkən, ilk növbədə müəllimin “Nizami Gəncəvi barədə bildiklərinizi yada salıb yığcam müzakirə aparın” tapşırığına uyğun olaraq, şagirdlər əvvəlki siniflərdə sənətkarın yaradıcılığı üzrə öyrəndikləri “Kərpickəsən kişinin dastanı”, “Yaralı uşağın dastanı” (V sinif) , “Sultan Səncər və qarı”(VIII sinif) mənzum hekayələrindən söz açırlar. Mövzu ilə bağlı əvvəlki biliklərin aşkara çıxarılması şairin yaşadığı dövrün, aldığı təlim-tərbiyənin başlıca xüsusiyyətlərinin müzakirəsinə zəmin yaradır.

2021-ci ilin “Nizami Gəncəvi İli” elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin Sərəncamında qeyd edilir: **“**Dünya ədəbiyyatının

görkəmli nümayəndəsi, dahi Azərbaycan şairi və mütəfəkkiri Nizami Gəncəvi bəşəriyyətin bədii fikir salnaməsində yeni səhifə açmış nadir şəxsiyyətlərdəndir. Böyük sənətkarın xalqımızın mənəviyyatının ayrılmaz hissəsinə çevrilmiş parlaq irsi əsrlərdən bəri Şərqin misilsiz mədəni sərvətlər xəzinəsində özünəməxsus layiqli yerini qoruyub saxlamaqdadır.

Nizami Gəncəvi ömrü boyu dövrün mühüm mədəniyyət mərkəzlərindən olan qədim Azərbaycan şəhəri Gəncədə yaşamış, Yaxın və Orta Şərq fəlsəfi-ictimai və bədii-estetik düşüncə tarixini zənginləşdirən ecazkar söz sənəti incilərini də məhz burada ərsəyə gətirmişdir. Onun geniş şöhrət tapmış "Xəmsə"si dünya poetik-fəlsəfi fikrinin zirvəsində dayanır".

Təcrübə göstərir ki, Nizaminin şəxsiyyəti, yaşadığı dövrü, mühiti, tarixi şəraiti aydınlaşdırılmadan şagirdlərdə onun dahi sənətkar kimi formalaşması haqqında dolğun təsəvvür yaratmaq çətindir. "Sənətkarı onu yetirib boya-başa çatdıran tarixi-ictimai şəraitdən təcrid edilmiş vəziyyətdə öyrənmək olmaz. Sənətkar öz zamanının oğludur, onun cəmiyyət hadisələrinə, həyat həqiqətlərinə dair müəyyən qənaətləri olmalı və onlar mütləq bədii yaradıcılıqda təzahürünü tapmalıdır" [1, s.481].

Bu məqsədlə məktəblilərin VII sinifdə "Azərbaycan tarixi" fənni üzrə mənimsədikləri biliklərə istinad edilməsi məqsədəuyğundur. Müzakirə zamanı qeyd edilir ki, XI-XII əsrlərdə Ərəb Xilafətinin tərkibinə daxil olan xalqların mədəniyyətinin qarşılıqlı təsiri nəticəsində yaranmış Müsəlman İntibahı Azərbaycanla sıx bağlı olmuşdur. Qədim və erkən orta yüzilliklərdə mədəniyyətin müxtəlif sahələrində böyük uğurlar qazanmış Azərbaycan xalqı bu mədəni oyanışa da dəyərli töhfələr bəxş etmişdir. Azərbaycan elmində, təhsilində, mədəniyyətində, xüsusən XI-XII əsrlərdə əhəmiyyətli yüksəliş baş vermişdir. Azərbaycan ədəbiyyatı Nizami Gəncəvinin (1141-1209) yaradıcılığı ilə özünün ən yüksək zirvəsinə ucaldı. Şairin "Xəmsə"si Şərq və dünya poeziyasının inkişafına güclü təkan verdi. Nizami humanist baxışlarına və insana verdiyi yüksək dəyərə görə müasirlərini, hətta ondan sonrakı dövrlərdə yaşayıb-yaratmış bir çox görkəmli humanistləri də ötüb keçmişdi [13, s.65]. Vətəni Azərbaycanda və bütün dünyada Nizami Gəncəvi kimi tanınan dahi söz ustadı doğulduğu, yaşayıb-yaratdığı, Azərbaycan Atabəyləri adlandırılan Eldənizlər tərəfindən idarə olunan Gəncə həmin dövrdə iqtisadi cəhətdən sürətlə inkişaf edirdi. İpək yolunun bu şəhərdən keçməsi də onun iqtisadiyyatına əhəmiyyətli dərəcədə təsir etmiş, mədəni mərkəzə çevrilməsində mühüm rol oynamışdır. Azərbaycanın mədəni həyatında böyük rol oynayan Gəncədə sənətkarlıq, elm və ədəbiyyat inkişaf edirdi.

Ümumiyyətlə, XI-XII yüzilliklərdə şimalda Şirvanşahların, cənubda Atabəylərin

hakim olduğu Azərbaycan iqtisadi-siyasi və mədəni cəhətdən yüksəliş dövrünü yaşayırdı. Elm və mədəniyyət digər xalqların, xüsusən islam ölkələri xalqlarının elm və mədəniyyəti ilə sıx əlaqədə inkişaf edir, maarifə xüsusi diqqət yetirilir, məktəblər, mədrəsələr, kitabxanalar açılırdı. Bütün bunlar bədii fikrin, ədəbiyyat və incəsənətin güclü inkişafına, yüzlərlə ədib və şairin yetişməsinə münbit zəmin yaradırdı. Müzakirə zamanı məktəblilər bu qənaətə gəlirlər ki, belə bir mühitdə Nizami kimi qüdrətli sənətkarın yetişməsi təsadüfi deyildi.

**Nizaminin həyat yolu və yaradıcılığının öyrədilməsi imkanları**

Dərsdə şagirdlər müəllimin tapşırığı ilə "Ədəbiyyat" dərsliyindəki "N.Gəncəvinin həyatı və yaradıcılıq yolu" mətnini oxuyur və aşağıdakı suallara cavab hazırlayırlar:

1. Şairin yaşadığı dövrün və aldığı tərbiyənin özəllikləri hansılardır?
2. Nizami yaradıcılığa hansı əsərlərlə başlamışdır? Bu əsərlərin əsas mövzusu nə idi?
3. Şairin poemalarında diqqət daha çox hansı mövzulara cəlb edilmişdir?

Mətnlə tanışlıqdan sonra fikir mübadiləsi və müzakirə aparılır. Müzakirə zamanı aydınlaşdırılır ki, Nizaminin həyatı haqqında doğru-dürüst məlumatı ilk növbədə özünün əsərlərindən almaq olur. Ömrü boyu Gəncədə yaşayan Nizami dövrünün tanınmış alimlərindən olmuşdur. Dahi sənətkar mükəmməl mədrəsə təhsili almış, fars və ərəb dillərindən başqa bir sıra dilləri, dini və dünyəvi elmləri, poetikanı, fəlsəfə, hüquq, tarix, coğrafiya, astronomiya, riyaziyyat, tibb, məntiq, kimya və digər elmləri öyrənmiş və bu dərin biliklər onun əsərlərində öz əksini tapmışdır. Bu qədər biliklərə yiyələnsə də, dahi sənətkar dünyasını dəyişənə qədər mütaliəsinə ara verməmişdir. Zəmanəsinin nüfuzlu adamlarından olan dayısı Xacə Ömər onun təlim-tərbiyəsi ilə ciddi məşğul olmuşdur.

Dərsdə Nizaminin böyük ədəbi istedadla yanaşı, ensiklopedik biliyə sahib olması, saraylara getməməsi, öz ailəsinə bağlılığının konkret faktlarla izah edilməsi məktəblilərdə onun qeyri-adi şəxsiyyəti barədə dolğun təsəvvür yaranmasına imkan verir. Şairin əsərlərindən və digər qaynaqlardan məlum olur ki, o, insanpərvər, müdrik, gözütox, ailəcanlı bir insan kimi hələ sağlığında müasirləri tərəfindən yüksək qiymətləndirilmişdir.

Bədii yaradıcılığa gənc yaşlarından lirik şeirlər yazmaqla başlayan Nizaminin qəzəlləri dillər əzbəri olmuş, el məclislərində, saraylarda oxunmuşdur. O, şeir və poemalarını saraylara, hökmdarlara göndərsə də, sarayda yaşamaq, saray şairlərinin sırasına qoşulmaq istəməmişdir. Nizaminin hökmdarların himayəsində – saraylarda yaşamaqdan, yazıb-yaratmaqdan imtina etməsinin səbəbi şagirdlərdə sual doğurur. Qeyd edilir ki, öz müasiri olan sənətkarlardan fərqli olaraq, Nizaminin saray şairi

olmaq istəməməsi təsadüfi deyildi. Saray mühitinin sənətkar müstəqilliyini əlindən alacağını, hətta həyatı üçün təhlükəli olduğunu Nizami öz poemalarında dəfələrlə qeyd etmişdir. Öz müasirlərinin – saray şeirinin ustadları olan Əbül-Üla Gəncəvi, Xaqani Şirvani, Fələki Şirvaninin acı taleyi də ədibin uzaqgörənliyini bir daha sübut edir.

Sənətkarın yaradıcılıq yolunun müzakirəsi zamanı şagirdləri belə bir sual maraqlandırır: "Azərbaycanda yaşayıb-yaradan Nizaminin öz əsərlərini fars dilində yazmasının səbəbi nədir?".

Bu məsələnin aydınlaşdırılmasında müəllimin şərhinə ehtiyac duyulur. Şagirdlərin diqqətinə çatdırılır ki, bu, ilk növbədə həmin dövrün ədəbi ənənələri ilə bağlı idi. Azərbaycanda farsca yazmaq ənənəsi XI əsrin ortalarından başlamış və bir neçə yüzillik davam etmişdir. Nizaminin müasiri olan Xaqani Şirvani, Məhsəti Gəncəvi də bu ənənəyə uyğun olaraq farsca yazıb-yaratmışlar. Nizamidən sonrakı dövrlərdə Nəsimi, Füzuli, Saib Təbrizi, Məhəmmədhüseyn Şəhriyar kimi qüdrətli sənətkarlar əsas əsərlərini ana dilində yazsalar da, fars dilində də ölməz sənət inciləri yaratmışlar.

"Dövrün ictimai-siyasi və ədəbi mövqeyindən çıxış edərək fars dilində yazıb-yaratması Nizami dühasının qısa zaman ərzində bütün Yaxın və Orta Şərqdə təsdiqi üçün məqsədəuyğun idi. Lakin şair fars dilində bir türk-azərbaycanlı səliqəsi, dəsti-xətti ilə qələmini işlədirdi. Xaqani və Nizami farscasının əsl fars şairlərinin dilindən əsaslı şəkildə fərqləndiyini, "türkanə ruhu"nu hətta görkəmli Nizamişünaslar da inkar etmirlər" [1. s.475].

Bu məsələ ilə əlaqədar "Leyli və Məcnun" poemasından "Kitabın nəzminə səbəb" hissəsini şagirdlərin diqqətinə çatdırmaq məqsədəuyğundur. 1188-ci ildə əslən türk olsa da, "ruhən farslaşmış" Şirvan şahı Axsitan qasid göndərərək Məcnun və Leylinin eşq dastanını yazmağı, fars-ərəb dili ilə ona zinət vurmağı xahiş edir. Doğma dilinə, digər əsərlərindəki "türkanə ruha" hökmdarın bu münasibəti "bizə layiq deyil, türkanə sözlər" deməsi şairin qəlbinə toxunur, o, öz hisslərini bu misralarla bildirir:

Ömrüm viran oldu, solub saraldım,
Bu əmrin önündə cavabsız qaldım.

Şair ürəyincə olmayan sifarişi qəbul etmək istəməsə də, oğlu Məhəmmədin təkidli xahişi ilə əsəri yazmaq qərarına gəlir.

Kurikulumun tələbinə uyğun olaraq, dərsdə mövzu ilə bağlı əlavə mənbələrlə iş təşkil edilir. Əlavə mənbə kimi məşhur şərqşünas alim Y.Bertelsin aşağıdakı fikri ilə şagirdlərin tanış edilməsi və onların münasibətinin öyrənilməsi faydalıdır: "Xəmsə"

Şərq İntibahının təməlini qoyan mənəvi-estetik dəyərlər sırasında ən mühüm (və müəyyənedici!) yerlərdən birini tutur və bu epik poema-romanlarla bərabər, onun lirikası da bəşəri ədəbiyyatın estetik inkişafında mühüm rol oynamışdır. Nizami Gəncəvinin əsərlərindəki coğrafi ünvanlara ötəri bir nəzər salmaq kifayətdir ki, onun yaradıcılığının ehtiva dairəsinin nə dərəcədə geniş olduğunu görəsən: antik Yunanıstan (Aleksandr Makedonskidən bəhs edən "İskəndərnamə"), yaxud əfsanəvi hökmdar Xosrovun vətəni İran ("Xosrov və Şirin"), yaxud da yeddi gözəlin təmsil etdikləri türk, yunan, slavyan, hind, Xarəzm, ərəb, Çin elləri ("Yeddi gözəl"). Bir mühüm xüsusiyyət də odur ki, bu qəhrəmanlar müxtəlif dinlərə mənsubdurlar və əlbəttə, bu cəhət Nizami dünyagörüşündə tolerantlığın nə dərəcədə yüksək yer tutmasının ifadəsi və göstəricisidir" [2, s.3].

Müzakirə zamanı qeyd edilir ki, Nizamiyə dünya şöhrəti qazandıran "Xəmsə"dəki beş poemada mühüm həyati problemlər qoyulmuş və onların bədii həlli verilmişdir. Poemalar, əsasən, fərqli mövzularda yazılsa da, onları birləşdirən cəhətlər də az deyildir; dövlətin ədalətlə idarə edilməsi, xalq və hökmdar, şərə, pisliklərə nifrət, insanın kamilləşməsində məhəbbətin rolu və s. poemaların hər birində bu və ya digər dərəcədə əksini tapmışdır. Bu, təsadüfi deyildir. Şairi ömrü boyu düşündürən humanist ideallar həmin əsərlərdə öz ifadəsini tapmaya bilməzdi.

Şərq intibahının görkəmli nümayəndəsi olan Nizaminin "İskəndərnamə" poeması Azərbaycan ədəbiyyatının ən dəyərli nümunələrindəndir. Təlim prosesində mürəkkəb kompozisiyalı, irihəcmli poemanın məzmununun mənimsədilməsi, təhlilinə fənn kurikulumuna uyğun olaraq, xüsusi dərs saatları ayrılmışdır. Dərsliyə bu irihəcmli, mürəkkəb kompozisiyalı əsərdən seçilmiş parçalar daxil edilsə də, məktəblilərin poemanın mətnini daha dərindən bilməsi zəruridir. Qabaqcıl müəllimlərin iş təcrübəsində belə irihəcmli əsərlərin metodik tələblərə uyğun olaraq, dərsə qədər müstəqil mütaliəsi təşkil edilir. Bu məqsədlə əsərin latın qrafikası ilə nəşr edilib məktəb kitabxanalarına çatdırılmış nüsxələrindən də istifadə olunur.

Əsərin təhlilinə həsr olunan dərslərdə şagirdlər ilk növbədə dərslikdəki "Təhlil üzrə iş" mətni ilə tanış olur, aşağıdakı suallar üzrə fikir mübadiləsi və müzakirəyə hazırlaşırlar:

1. Poema hansı mövzuda yazılmışdır? Şairin bu mövzuya müraciət etməsinə səbəb nədir?
2. İskəndərin xarakterindəki başlıca cəhətlər hansılardır?
3. Onun davranış və əməllərində, başqalarına münasibətində diqqəti daha çox cəlb edən nədir?
4. Poemadakı hökmdar obrazları hansı səciyyəvi xüsusiyyətləri ilə diqqəti cəlb

edir? Onların oxşar və fərqli cəhətləri hansılardır?

5. Poemanın maraqla oxunmasına səbəb nədir? Onu mənzum roman adlandırmaq olarmı?
6. Poemanın ideyasının əsasında hansı fikirlər dayanır?

Ədəbiyyat dərslərində əsərin təhlili zamanı şagirdlərə aydın olmalıdır ki, Nizaminin Makedoniyalı İskəndərlə bağlı mövzuya müraciət etməsi təsadüfi deyildir. Yaxın və Orta Şərqdə böyük şöhrət qazanmış İskəndər şairə hökmdar və xalq, ictimai ədalət, dövlətin idarə olunması, dünyanın dərk edilməsi kimi mühüm məsələlər haqqında görüşlərini ifadə etməyə imkan verirdi. Nizami ictimai-siyasi, fəlsəfi-elmi, əxlaqi-etik düşüncələrinə məhz bu sonuncu əsərində yekun vurmuşdur. Elə buna görə də poema ideya baxımından çox zəngin, məzmunca maraqlı, bədii cəhətdən mükəmməldir. Deməli, əsərin ideyasından danışarkən, onda bədii həllini tapmış mühüm məsələləri əhatə etmək vacibdir.

Makedoniyalı Aleksandrın – İskəndərin həyat və fəaliyyətini bioqrafik, tarixi əsərlərdən, əfsanə və rəvayətlərdən, müxtəlif dillərdə əlyazmalardan dərindən öyrənən alim-mütəfəkkir, şair yaratdığı İskəndər obrazı ilə öz insan və həyat fəlsəfəsini, romantik ictimai görüşlərini əks etdirmişdir. Bu əsər bəşəriyyətin səadətini düşünən, xoşbəxt cəmiyyətdə yaşayan insan və ideal ictimai həyat arzulayan Nizaminin həqiqət, mənəvi gözəllik və ahəng axtarışlarının zirvəsi idi. Mütəfəkkir şairin öz humanist ideallarının daşıyıcısına çevirdiyi bu obraz tarixi şəxsiyyət olan İskəndərdən yeni məzmun, məna, rəng çalarları ilə fərqlənir.

Ədəbiyyat dərslərində Nizami yaradıcılığının humanist mahiyyəti, mövzu, ideya-bədii məziyyətlərinin müzakirəsi zamanı şagirdlərin mənimsədiyi biliklər aşağıdakı şəkildə ümumiləşdirilir:

- *Nizaminin humanizmi*. Şairin humanist görüşlərində sosial ədalət idealı aparıcı yer tutur. Onun humanist sənətində zülmə, şərə, hər cür çirkinliyə qarşı mübarizə, xəlqilik, kamil insan, onun mənəvi, yaradıcı qüdrətinə inam hissi öz əksini tapmışdır. Şair bütün insanların xoşbəxt yaşayacağı ideal, ədalətli cəmiyyət arzulamış, belə bir kamil ölkənin nümunəsini yaratmışdır. Böyük sənətkarın əsərlərində Xeyirin Şər üzərində qələbəsi haqqın, ədalətin təntənəsi kimi vurğulanır.
- *Millilik və beynəlmiləlçilik şairin yaradıcılığında üzvi vəhdət təşkil edir*. O, öz əsərlərində soydaşlarının – yüksək mənəvi dəyərlərə malik Azərbaycan türklərinin parlaq obrazlarını yaratmışdır. Bununla yanaşı, ədib yunan, çin, rus, fars, hind, ərəb surətləri də yaratmış, öz qəhrəmanlarına irqindən, milli mənsubiyyətindən asılı olmayaraq, əməlləri və mənəviyyat meyarları

baxımından yanaşmışdır.

- *Nizami yaradıcılığında eşqə münasibət*. İnsanın gözəlliyini vəsf edən şair onun xoşbəxtliyinin təməlini eşqdə, saf məhəbbətdə görürdü. O, insanı ucaldan, mənən zənginləşdirən, xarüqələr yaratmağa sövq edən sevgi hissinin ülviliyini, yüksək sənətkarlıqla nəzmə çəkmişdir. Nizaminin eşq fəlsəfəsinə görə, sevgi mənəviyyatca pak olan insanların qismətidir. Hiyləgər, yalançı və fitnəkar insanın qəlbində saf məhəbbət ola bilməz. Eyni zamanda şair insanla zaman, mühit arasındakı təzadı da həyat həqiqəti kimi əks etdirmiş, sevən insanların faciəsini sevgiyə, xoşbəxtliyə vaxtı keçmiş adət-ənənə çərçivəsində baxan cəmiyyətin faciəsi kimi ümumiləşdirmişdir.
- *Hökmdar və xalq problemi*. Nizami mədhiyyə və qəsidələrindən fərqli olaraq, mənzum hekayələrində hökmdarla xalqın qarşılıqlı münasibətini, ölkənin ədalətlə idarə edilməsinin vacibliyini dönə-dönə vurğulamışdır. Əsərlərində xalq və hökmdar probleminə xüsusi diqqət yetirilməsi şairin insana məhəbbətindən irəli gəlirdi. Xalqa dərin rəğbət bəsləyən, ictimai ədalət ideyasını, insan ləyaqətinin ucalığını ön plana çəkən sənətkar, yeri gəldikcə sadə insanların dili ilə şahları ittiham etmiş, onları mənəvi-əxlaqi təkamüldə, öz nöqsanlarını anlayıb saflaşmasını təsvir etmişdir.

Şairin fikrincə, hökmdarlıq çox ağır, çətin bir iş olub, böyük məsuliyyət tələb edir. Xalq və dövlət üçün cavabdeh olan şəxs – hökmdar öz vəzifə borcunu bir anlığa da olsa, unutmamalı, laqeydliyə, biganəliyə yol verməməlidir. Dövlət işlərini başqalarına etibar etmək olmaz, bu, böyük fəlakətə səbəb ola bilər. Şairin əsərlərində ölkənin idarə olunması, cəmiyyətdə bütün insanları əhatə edən ədalətin qorunub saxlanılması kimi bütün zamanlar üçün vacib olan suallara tutarlı cavab verilmişdir.

- *Əmək, əməkçi insan mövzusu*. Nizami əməyi insanın firavanlığının rəhni saymış, halal zəhmətə xor baxanları tənbəl, tüfeyli, nadan hesab etmişdir. Əməyə, elmə, sənətə hörmət bəsləyən, sadəliyi, təvazökarlığı, əməksevərliyi, var-dövlət hərisi olmamağı uca tutan dahi sənətkar gəncləri faydalı işlərlə məşğul olmağa, mənasız ömür sürməməyə çağırmışdır. Şairin yaratdığı əməkçi insan obrazları nikbinliyi, müdrikliyi, uzaqgörənliyi, iradəliliyi ilə diqqəti cəlb edir. Sadə xalqın nümayəndələri olan bu insanlar – kərpickəsən kişi, əkinçi mənəvi keyfiyyətləri, sədaqəti, halallığa bağlılığı ilə seçilir.
- *Şairin yaradıcılığında qadına münasibət*. Nizami yazılı ədəbiyyatımızda ilk dəfə olaraq parlaq qadın obrazları yaratmışdır. Onun əsərlərindəki qəhrəman, vəfalı Şirin, Nüşabə, Leyli, Fitnə, Nüstəndərcahan obrazları sənətkarın qadına münasibətini, arzu və ideallarını əks etdirir.

## Nəticə / Conclusion

Nizaminin həyat və yaradıcılığının, bu gün də müasir səslənən qlobal, ümumbəşəri problemləri böyük sənətkarlıqla əks etdirən həmişəyaşar sənət nümunələrinin öyrənilməsinə həsr olunmuş müasir ədəbiyyat dərsləri mövcuddur. Bu dərslərdə yeni təlim texnologiyalarından, tədqiqat, müzakirə, diskussiya, debat və s. interaktiv metodlardan məqsədyönlü istifadə, fərdi, cütlər, kiçik və böyük qruplarla iş, dərsdə sənətkarın öz əsərləri ilə yanaşı, əlavə mənbələrin şagird tədqiqatı prosesinə cəlb edilməsi, müəllim-şagird, şagird-şagird əməkdaşlığının təmin olunması təlimin səmərəliliyini artırır, şagirdlərin mənəvi-estetik tərbiyəsinə müsbət təsir göstərir.

## İstifadə edilmiş ədəbiyyat / References


1. Azərbaycan ədəbiyyatı tarixi. (2007). Altı cilddə, II cild. Bakı, Elm. 632 s.
2. Bertels Y. (2017). Böyük Azərbaycan şairi Nizami. Bakı, Təhsil. 168 s.
3. Ədəbiyyat (X sinif şagirdləri üçün vəsait).
4. Əliyev S., Həsənov B., Mustafayeva A. (2017). Ədəbiyyat. X sinif üçün dərslik. Bakı, Bakınəşr. 208 s.
5. Əliyev S., Həsənov B., Mustafayeva A. (2017). Ədəbiyyat. X sinif. Müəllim üçün metodik vəsait. Bakı, Bakınəşr. 208 s.
6. Gəncəvi N. (2004). Xosrov və Şirin. Bakı, Lider. 392 s.
7. Gəncəvi N. (2004). İskəndərnamə: Şərəfnamə. Bakı, Lider. 432 s.
8. Gəncəvi N. (2004). İskəndərnamə: İqbalnamə. Bakı, Lider. 256 s.
9. Gəncəvi N. (2004). Leyli və Məcnun. Bakı, Lider. 288 s.
10. Gəncəvi N. (2004). Lirika. Bakı, Lider. 160 s.
11. Gəncəvi N. (2004). Sirlər xəzinəsi. Bakı, Lider. 264 s.
12. Həbibbəyli İ. (2019). Azərbaycan ədəbiyyatı dövrləşdirmə konsepsiyası və inkişaf mərhələləri. Bakı, Elm. 452 s.
13. Mahmudlu Y., Əliyev Q., Hüseynova L., Ağayev S. və b. (2018). Azərbaycan tarixi. VII sinif üçün dərslik. Bakı, Təhsil. 128 s.
14. Səfərli Ə., Yusifli X. (2008). Azərbaycan ədəbiyyatı tarixi (qədim və orta əsrlər). Bakı, Ozan. 632 s.
15. https://president.az/articles/49904